UOT: 338.45

# AQRAR SAHƏNİN DAYANIQLI SOSİAL-İQTİSADİ İNKİŞAFINDA İNVESTİSİYANIN ROLU

**Y.X.VƏLİYEV**
**Azərbaycan Tibb Universiteti**

*Məqalədə aqrar sahənin müasir investisiya potensialının inkişafi barədə danışılır.*

*Burada müəllif investisiya potensialının inkişafi strategiyasının, aqrar istehsalın daxili və xarici investisiyanın əsasında inkişaf etdirilməsi, investisiya qoyuluşunun ölkə iqtisadiyyatına cəlb edilməsi və dövlət tərəfindən büdcəsindən səmərəli istifadə edilməsi kimi mühüm məsələləri tədqiq edir. Məqalədə aqrar sahənin investisiya və subsidiya qoyuluşu amillərinin inkişafının təmin olunmasına daha çox yer verilir.*

*Yekunda müəllif tərəfindən tədqiqat əsasında əldə edilmiş nəticələr əks olunur.*

***Acar sözlər:*** *Kənd təsərrüfatı, ərzaq istehlakı, iqtisadi səmərəlilik, kredit, innovasiya - investisiya, subsidiya, sahibkarlıq fəaliyyəti.*

Müasir şəraitdə kənd təsərrüfatının davamlı inkişafının təmin edilməsi bütövlükdə aqrar ərzaq kompleksinin mövcud ola bilən struktur deformasiyalarının aradan qaldırılması və kompleksin investisiya cəlbediciliyinin yüksəldilməsindən bilavasitə asılıdır.

Odur ki, aqrar sahəyə investisiyaların kütləvi axınının stimullaşdırılması müasir şəraitdə dövlətin aqrar siyasət strategiyasının ən mühüm elementi olmalıdır. Hər şeydən əvvəl dövlət səviyyəsində aqrar sahənin inkişafı üçün bazar mühitinə ekvivalent iqtisadi cəhətdən əlverişli şərait formalaşdırılmalı və bütövlükdə aqrar iqtisadiyyat investisiya rcsursları ilə dayanıqlı şəkildə təmin edilməlidir.

Ölkə iqtisadiyyatının sabit inkişafını təmin etmək, bütün sahələrdə investisiyaları cəlb etmək üçün güzəştli vergiqoymanı tətbiq etməklə, eləcə də ikiqat vergiqoymadan azad etməklə daxili və xarici investorlara öz investisiyalarını respublikamızın iqtisadiyyatına yönəltmələrinə stimulu gücləndirmək olar. Başqa sözlə desək, ölkəyə daxili, xarici investorların axınını gücləndirmək üçün onların vahid dövlət orqanı tərəfindən idarə olunması və müvafiq sahələrə yönəldilməsi tənzimlənməlidir.

Bütövlükdə iqtisadiyyatda aqrar sahədə investisiya siyasətinin aşağıdakı prinsiplər əsasında aparılması tövsiyə olunur:

- büdcə tarazlığının təmin edilməsi və inflyasiya səviyyəsinin aşağı salınması əsasında iqtisadiyyatın real sektorunda investisiya səmərəliliyinə müvafiq olaraq faiz dərəcələrinin aşağı salınması;
- bazar subyektləri arasındakı hesablaşmalarda barterin xüsusi çəkisinin tədricən məhdudlaşdırılması əsasında ödəmə probleminin həlli;
- mövcud vergi sisteminin sadələşdirilməsi və strukturun yenidən qurulması, həmçinin amortizasiya siyasətinin təkmilləşdirilməsi əsasında bazar subyektlərinin investisiya imkanlarının genişləndirilməsinə xidmət edən vergi islahatlarının aparılması;
- aqrar sahə müəssisələrinin investisiya cəlbediciliyinin yüksəldilməsi;
- əhalinin əmanətlərinin cəlb edilməsi, eləcə də daxili və xarici investorların stimullaşdırılması məqsədilə investisiya risklərinin aşağı salınması üzrə təşkilati-hüquqi mexanizmin formalaşdırtlması (2, s. 174-183).

Tədqiqatlar göstərir ki, Azərbaycan iqtisadi müstəqilliyinə qədəm qoyduqdan sonra ölkədə investisiyalar əsasən iqtisadiyyatın neft sektoruna yönəldilmiş, nəticədə isə neftdən və beynəlxalq bazar konyukturundan asılılıq formalaşmışdır. Ölkənin qeyri-neft sektorunun digər sahələrində olduğu kimi, aqrar bölmədə də investisiyaya ehtiyac yaranmış, əsas istehsal fondlarından istifadənin iqtisadi səmərəliliyi xeyli azalmış və fondların fiziki, mənəvi cəhətdən köhnəlməsi prosesi artmışdır. Hesablamalar göstərir ki, respublikada mövcud olan bütüı əsas fondların təxminən 60%- nin orta istismar müddəti artıq 10 ili ötüb keçmişdir (3, s. 345-346). Odur ki, ölkə iqtisadiyyattnın inkişaf etdirilməsi və dövlətin strateji hədəflərinin reallaşdırılması investisiya qoyuluşlarının iqtisadiyyatın ayrı-ayrı sahələri üzrə optimal bölgüsünün həyata keçirilməsini tələb edir. Bütün bunlar isə investisiya fəaliyyətinin dövlət tənzimlənməsi vasitəsilə reallaşdırılmalıdır.

Bununla bərabər, yerli investisiyaların axını və bunun əsasında yerli istehsalın inkişafı stimullaşdırılmalıdır. Bu zaman yerli istehsalçıların mənafeyi elə qorunmalıdır ki, onlar xarici istehsalçılarla rəqabətə girə və rəqabətqabiliyyətli məhsul istehsal edə bilsinlər. Prioritet sahələrə aid edilməklə ixracat potensialını artıran və xarici bazarlara məhsul çıxaran müəssisələrə investisiya qoyuluşlarının stimullaşdırılması dövlət səviyyəsində tənzimlənməlidir. Aqrar bölmənin aparıcı sahələrinin üstün sürətlə inkişafını təmin etmək üçün normativ-hüquqi, qanunvericilik aktların və qərarların

qəbulu zamanı həmin sahələrin inkişaf etdirilməsinə yönəldilən investisiyalar stimullaşdırılmalıdır.

Aparılan araşdırmalar göstərir ki, investisiya fəaliyyətinin aktivləşdirilməsi təkcə kənd təsərrüfatının inkişaf etdirilməsinin başlıca ilkin şərti olmaqla yanaşı, həmçinin, kənd təsərrüfatı ilə bağlı digər sahələrin də davamlı inkışafının ən mühüm faktoru kimi çıxış edir. Kənd təsərrüfatının investisiya cəlbediciliyinin yüksəldilməsi üçün təkcə transformasiya yönümlü dəyişikliklərin aparılması önəmlı rol oynamır. Bunun üçün başlıca ilkin şərtlərdən biri kənddə institutsional dəyişikliklərin həyata keçirilməsidir. Qeyd etmək lazımdır ki, transformasiya yönümlü dəyişikliklər aqrar islahatların ilkin mərhələsində prioritet rol oynamaqla yanaşı həm də aqrar sahəyə iri miqyaslı investisiyaların cəlb edilməsində də əhəmiyyətli rol oynayır.

Məlum həqiqətdir ki, iqtisadiyyatın ən mühüm strateji əhəmiyyətli sahələrindən olan aqrar ərzaq kompleksinin bütün sferaları, o cümlədən kənd təsərrüfatı, emal sənayesi və kəndin sosial sferası daha çox investisiya tutumludur. Odur ki, aqrar sahəyə investisiyaların kütləvi axınının stimullaşdırılması müasir şəraitdə dövlətin aqrar siyasət strategiyasının ən mühüm elementi olmalıdır.

İnkişaf etmiş ölkələrin təcrübəsi göstərir ki, kənd təsərrüfatında investisiya cəlbediciliyinin yüksəldilməsi ilk növbədə istehsal potensialının yeniləşdirilməsindən, elmi-texniki tərəqqinin ən yeni nailiyyətlərinin təcrübəyə tətbiq edilməsindən, eləcə də resursqoruyucu texnologiyaların reallaşdırılması hesabına kənd təsərrüfatı məhsulları istehsalının iqtisadi səmərəliliyinin artırılmasından bilavasitə asılıdır. Kənd təsərrüfatında investisiya fəaliyyətinin genişləndirilməsi ilk növbədə aqrar istehsalın modernləşdirilməsinə və rekonstruksiyasına xidmət edir. Bu baxımdan dövlət tərəfindən həyata keçirilən dəstəklənmə tədbirləri innovasiyaların investisiya təminatı hesabına istehsalın intensivləşdirilməsinə istiqamətlənməlidir.

Bazar münasibətləri şəraitində dövlət investisiya proseslərinin genişlənməsinə istiqamətlənmiş tənzimləyici tədbirlər həyata keçirilməlidir ki, bunun da əsas motivini azgəlirli sahələrin, o cümlədən kənd təsərrüfatının investisiya cəlbediciliyinin yüksəldilməsi təşkil etməlidir. Dövlət tərəfindən kənd təsərrüfatının investisiya cəlbediciliyinin yüksəldilməsinə istiqamətlənmiş tədbirlər sisteminə aşağıdakıları şamil etmək olar:

- kənd təsərrüfatı və onunla qarşılıqlı əlaqəyə malik olan sahələrdə məhsulun satışı və xidmətlərin göstərilməsi zamanı təminatlı qiymətqoyma sisteminin tətbiqi;
- mülkiyyət mənsubiyyətindən asılı olmayaraq kənd təsərrüfatı əmtəə istehsalçılarının güzəştli kredit resursları ilə təmin edilməsi;
- aqrar sahənin maraqları nəzərə alınmaqla çevik vergi və amortizasiya siyasətinin həyata keçirilməsi;
- aqrar sahədə lizinq fəaliyyətinin genişləndirilməsinə istiqamətlənmiş tədbirlərin həyata keçirilməsi;
- kənd təsərrüfatında sahibkarlıq fəaliyyətinin stimullaşdırılması və özəlləşdırmə prosesinin səmərəliliyinin yüksəldilməsi məqsədilə investorlara güzəştlərin şamil edilməsi;
- məqsədli dövlət maliyyələşdirilməsi proqramlarının həyata keçirilməsi;
- aqrar ərzaq kompleksinin bütün sferalarında investisiyalaşdırma və kapital qoyuluşlarının prioritet istiqamətlərinin müəyyənləşdirilməsi;
- kənd təsərrüfatında kapital qoyuluşlarının indiqativ planlaşdırma əsasında həyata keçirilməsi.

Aqrar sahədə digər bir istiqamətə də lizinq vasitəsilə maddi aktivlərə investisiya qoyulması mümkünlüyünə nəzər salaq. Lizinq ilə investisiyaların oxşar olmasını nəzərə alaraq lizinq münasibətlərini investisiya əməliyyatı hesab etmək mümkündür. Buna görə də iqtisadi baxımdan lizinqin tam tərifi aşağıdakı kimi olardı: lizinq aktivlərin alınmasından və sonradan icarəyə verilməsindən ibarət olan, kreditə əsaslanan investisiya əməliyyatında yaranan əmlak münasibətləri kompleksidir.

Aqrar sahədə lizingin səciyyəvi cəhəti olan əsas kapitalın icarəsi, eləcə də lizinq əməliyyatının müddətindən irəli gələn uzunmüddətli kreditvermə forması onu göstərir ki, lizinq zahirən investisiya əməliyyatlarına oxşayır. Bütövlükdə, investisiyaların aşağıdakı növlərini fərqləndirmək qəbul edilmişdir:

- fiziki aktivlərə investisiyalar;
- pul şəklində aktivlərə investisiyalar;

Beləliklə, mülkiyyət hüququnun aktiv və həmin aktivdən istifadə etmək hüququ şəklində bölünməsinə əsaslanan lizinq əməliyyatı iqtisadi fəaliyyət forması kimi kredit , icarə və investisiya elementlərini özündə birləşdirir.

Mürəkkəb sosial-iqtisadi hadisə olan lizinq çoxukladlı aqrar iqtisadiyyatın formalaşması və onun təsərrüfatçılıq subyektlərinin istehsal fəaliyyətinin güclənməsi ilə əlaqədar çox mühüm funksiyaları yerinə yetirir. Aqrar sahədə istifadə edilən lizinqin çoxsaylı funksiyaları arasında maliyyə, istehsal, təchizat funksiyalarını və vergi güzəştlərinin təmin edilməsini fərqləndirmək məqsədəuyğundur.

Nəticə etibarilə aqrar sahədə lizinq əmtəə və xidmətlər spektri təkliflərinin şaxələndirilməsinə şərait yaradır. Bu sahəyə yeni obyektlər cəlb edir; istehsal vasitələri bazarını inkişaf etdirir və şaxələndirir, innovasiya şəraitində texnikanın yeni növlərinin mənimsənilməsi təşkilini qısaldır. Lizinq prosedurunun optimal quruluşuna nail olmağın mümkünlüyünü, son nəticədə lizinqin iqtisadi tərkib hissəsinin – lizinq ödəmələrinin məbləğinin səmərəli idarə edilməsi və həyata keçirilən əqdin bütün tərəflərinin maraqlarının nəzərə alınmasından asılı olur.

Kənd təsərrüfatında investisiya fəaliyyətinin stimullaşdırılması məqsədilə əsas fondların yeniləşdiril-

məsi və kənd təsərrüfatında kapital qoyuluşlarının artırılması diqqət mərkəzində saxlanılmalıdır. Bu baxımdan sürətli amortizasiya fəaliyyətinin həyata keçirilməsi də mühüm əhəmiyyət kəsb edır. Sürətli amortizasiya fəaliyyətinin həyata keçirilməsi ilk növbədə dövlətin ivestisiya siyasətindən bilavasitə asılıdır. Bu məqsədlə kənd təsərrüfatında əsas fondların bərpa dəyərinin dövrü olaraq indeksləşdirilməsi tətbiq edilməli və aktiv şəkildə sürətli amortizasiya fəaliyyəti həyata keçirilməlidir. Bundan əlavə amortizasiya fondlarının saxlamlmasının və xərclənməsinin xüsusi rejimi müəyyənləşdirilməlidir.

Aqrar sahənin investisiya resurslarına olan tələbatının ödənilməməsi son nəticədə səmərəli fəaliyyət imkanlarına malik aqrar bazar infrastrukturunun formalaşmasında da problemlər yaradır. Aqrar sahənin investisiya resurslarına olan tələbatının ödənildiyi şəraitdə bu infrastrukturlar aqrar bazarın səmərəli fəaliyyət göstərməsinə, istehsalçı və istehlakçılar arasında qarşılıqlı zəruri əlaqələrin formalaşmasına əlverişli şərait yaratmaqla, məhsulların satışı, daşınması və çatdırılmasına əhəmiyyətli dərəcədə yardım göstərər. Bu baxımdan aqrar iqtisadiyyatın spesifik xüsusiyyətləri nəzərə alınmaqla ixtisaslaşdırılmış torpaq, maddi-texniki resurs, kapital bazarlarının formalaşdırılmasına dövlət tərəfindən təşkilati, texniki və iqtisadi yardım göstərilməsi mühüm əhəmiyyət kəsb edır.

Odur ki, dövlətin aqrar sahədə investisiya siyasətinin başlıca məqsədi istehsalın və keyfiyyətin artırılması yolu ilə rəqabətə davamlı aqrar bölmə yaradılmasından ibarətdır. Təhlil göstərir ki, Azərbaycan kənd təsərrüfatı istehsalının mövcud səmərəliliyini artırmaq və öz müqayisəli üstünlük mövqelərini təkmilləşdirmək potensialina malikdir. Bu baxımdan aqrar sahə kənd əhalisi üçün uzunmüddətli məşğulluq şəraiti yarada bilər ki, bu da nəinki daxili tələbat üçün təminatlı ərzaq bazarı, həm də yüksək mənfəətli ixrac üçün məhsulların istehsalına yönəldilərək ixtisaslaşmış kənd təsərrüfatı yaradılması vasitəsilə əldə edilə bilər.

Milli iqtisadiyyatın vacib sahəsi kimi kənd təsərrüfatının inkişafı ölkənin maliyyə potensialının əsas parametrlərindən, onların dinamikasından və təbii ki, maliyyə siyasətinin yönümündən asılıdır. Nəzərə almaq lazımdır ki, rəqabət şəraitində aqrar sahənin maliyyə təminatının səviyyəsi məhz proteksionist siyasətin xarakterindən asılı olur. Bu siyasətin mahiyyəti bir növ milli iqtisadiyyatın himayə olunması kimi qəbul edilır. Belə ki, xarici mallara (idxala-importa) gömrük rüsumu artırılaraq onların ölkəyə gətirilməsi azaldılır, ölkədə istehsal olunan məhsulların istehsalı və xaricə ixracı stimullaşdırılır.

Kənd təsərrüfatının və onun ayrı-ayrı sahələrinin, o cümlədən bitkiçiliyin, üzümçülüyün, tütünçülüyün, şəkər çuğunduru istehsalının, toxumçuluğun, baramaçılığın, heyvandarlığın inkişaf etdirilməsi üzrə məqsədli tədbirlərin həyata keçirilməsinə böyük zərurət vardır. Odur ki, yerli aqrar istehsalın kreditləşmə ilə təmin ediıməsi yaxın gələcəkdə müsbət nəticələr əldə edilməsinə zəmin yaradır. Kənddə işıq, qaz və su, o cümlədən suvarma problemlərinin həlli inkişaf templərini daha da artıra bilər.

Texnika və avadanlığa, habelə digər istehsal təyinatlı mallara olan tələbatın zəruri səviyyədə ödənilməsi, sıradan çıxmış suvarma sistemlərinin bərpası və ya yenilərinin inşa edilməsi, torpağın münbitliyinin bərpa edilməsi istiqamətində planlı fəaliyyətın həyata keçirilməsi, kübrə və digər kimyəvi preparatlara olan tələbatın ödənilməsindəki çətinliklərin aradan qaldırılması, toxumla təchizatın səmərəli təşkil edilməsi, emal müəssisələri şəbəkəsinin genişləndirilməsi kənd təsərrüfatı məhsullarının istehsalının artırılmasında mühüm əhəmiyyət daşıyan amillərdir.

Aqrar sahənin tam mənada intensiv inkişafına nail olmaq üçün bu sahənin maksimum dərəcədə maliyyələşdirilməsinə ehtiyac var. Lakin kənd təsərrüfatı istehsalına vəsait qoyuluşu arzu olunan səviyyədə deyil. Odur ki, sahənin investisiya cəlbediciliyinin yüksəldilməsi xüsusi aktuallıq kəsb edir. Çünki bu vəsaitlər kənd təsərrüfatının daha da inkişaf etdirilməsi üçün əvəzedilməz rol oynaya bilər. Belə ki, həmin vəsaitlərin:

- istehsalın və məhsul emalı texnologiyalarının yeniləşdirilməsinə;
- istehsalın (emalın), innovasiyanın inkişafına;
- istehsalın genişləndirilməsinə;
- itirilmiş infrastrukturun və yeni infrastrukturun bərpasına və yeni infrastruktur sahələrinin yaradılmasına;
- aqrar elmin inkişafına və fundamental aqrar elmi tədqiqatlara yönəldilməsi məqsədəuyğundur.

Sözsüz ki, cəlb edilən vəsaitlərin tez bir zamanda büdcə gəlirlərinin artırılmasına səbəb olacağı haqqında fikir söyləmək reallıqdan uzaq məsələdir. Lakin ölkənin etibarlı ərzaq təminatı və dayanıqlı inkişafının təminatçısı kimi aqrar sahənin 2008-ci ildən başlayaraq əldə olunmuş inkişaf templərinin daha da qaldırılması baxımından strateji seçim olaraq lazımi vəsait təminatına nail olmaq zəruri məsələlərdəndir.

**ƏDƏBİYYAT**

**1.** "2008-2015-ci ildə Azərbaycan Respublikasında əhalinin ərzaq məhsulları ilə təminatına dair Dövlət proqramı". "İqtisadiyyat" qəzeti 28 avqust – 3 sentyabr 2008. **2.** Abbasov I. Ərzaq təhlükəsizliyi və kənd təsərrüfatının prioritet istiqamətləri. Bakı, "Elm və Təhsil", 2011. 640 s. **3.** Azərbaycanını Kənd Təsərrüfatı, Statistik məcmuə. Bakı, "Dada" 2013. **4.** Zeynalov F.D. İnvestisiyalar və Azərbaycanda onların mövcud durumu. Bakı, "Elm" 2011. 153 s. **5.** Сабрук В.П. Практическая энциклопедия финансового менеджмента 3-е изд. К: Companion Group 2008. 88 с.

**Роль инвестиции в устойчивом социально-экономическом развитии аграрного сектора**

**Я. Х. Велиев**

В данной статье говориться о потенциале развития современных инвестиций в аграрной отрасли. Здесь автор рассматривает такие задачи как: стратегия развития потенциала инвестиций, развитие аграрного производства на основе внутренних и зарубежных инвестиций, пропаганда инвестиций для вовлечение её в экономику страны со стороны государства. В статье большое место уделяется обеспечению инвестиций и субсидий в аграрной отрасли.

В конце автор отражает свои результаты на основе проведенного им исследования.

***Ключевые слова:*** Сельское хозяйство, потребление продовольствия, экономическая эффективность, кредит, инвестиции, субсидии, предпринимательская деятельность.

**The role of investment in agrarian sector of sustainable Social economic developm**

**Y. X. Valiyev**

Discussed about the development of modern investment potential of Agrarian sector in this article.

Author researches the following issues **-**Development strategy of modern investment potential of Agrarian Sector that should be developed on the base of domestic and foreign investments and one of the most important issues. As on efficient utilization of state budget it is also mainly stated that to secure the development of subsidiaries factors and investment of Agrarian sector.

***Key words:*** Aqriculture, fond consumption, credit, investment, subsidy, entrepreneneurial activity.

